**UOT 633.1:631.45:333**

# TAXILÇILIQ VƏ ÜZÜMÇÜLÜK MƏHSULLARI BAZARINDA QİYMƏTLƏRİN TƏNZİMLƏNMƏSİ İSTİQAMƏTLƏRİ

**C.C. ALLAHVERDİYEVA**
**Azərbaycan Dövlət Aqrar Universiteti**

*Aqrar sektorun əsasını təşkil edən taxılçılıq və üzümçülük bu sahədə mühüm əhəmiyyət kəsb edir. Çünki bu sahələr əhalinin qida məhsullarına olan tələbatını ödəməklə yanaşı, həm də heyvandarlığın qüvvəli və qaba yemə olan tələbatının ödənilməsində mühüm rol oynayır.*

*Bazar hərəkətinin əsas istiqaməti qiymətdir. Qiymət əmtəələrin, məhsulların və xidmətlərin dəyərinin pul formasını özündə ifadə edir. Həm istehsal məsrəflərinin ödənilməsi, həm də müəssisənin gəliri qiymətdən asılıdır. O, resursların konkret istehsala istiqamətləndirilməsini tənzimləyir. Bazar münasibətlərinin inkişafı şəraitində qiymət bir sıra funksiyaları yerinə yetirir və müxtəlif qiymət növlərinə bölünür.Qiymət əmələ gəlmənin ən sadə yolu məhsulun maya dəyəri üzrə müəyyən, standart qiymət artımının əlavə edilməsindən ibarətdir. Qiymət artımının ölçüləri məhsul növlərindən asılı olaraq geniş hüdudlarda dəyişir.*

***Açar sözlər:*** *taxılçılıq, bazar, maya dəyəri, qiymət, rəqabət, keyfiyyət, tənzimləmə.*

XX əsrin sonlarına doğru aqrar sektorda daxil olmaqla, Azərbaycan Respublikası iqtisadiyyatının əksər sahələrində bazar iqtisadiyyatına keçidlə bağlı aparılan radikal islahatlar demək olar ki, başa çatmaq üzrə idi və bu dövrdən başlayaraq iqtisadi tənzimlənmənin qarşısında yeni bir mərhələ islahatlar nəticəsində yaranmış, yeni bazar münasibətləri və strukturlarının kəmiyyət və keyfiyyət baxımından daha da təkmiləşdirilməsinə imkan verən inkişaf strategiyasının qurulması və reallaşdırılması mərhələsi dayanmışdır.

Müasir mərhələdə iqtisadiyyatı keçid dövründə olan ölkələr üçün iqtisadi inkişafda qiymətləndirmə başlıca rol oynayır. Bazar iqtisadiyyatı sərbəst, iqtisadi cəhətdən əsaslandırılmış qiymətləri formalaşdıran əmtəə istehsalçılarına istinad edilir ki, bu da düzgün qiymət siyasəti, qiymətlərin formalaşmasında strategiya və taktikanın dəqiqliyi, qiymətin düzgün metodunun seçilməsini zəruri edir.

Azərbaycanda əhalinin etibarlı ərzaq təminatı dövlətin iqtisadi siyasətinin başlıca istiqamətlərindən biridir. Aqrar sektorun əsasını təşkil edən taxılçılıq və üzümçülük bu sahədə mühüm əhəmiyyət kəsb edir. Çünki bu sahələr əhalinin qida məhsullarına olan tələbatını ödəməklə yanaşı, həm də heyvandarlığın qüvvəli və qaba yemə olan tələbatının ödənilməsində mühüm rol oynayır. Odur ki, taxılçılıq və üzümçülük sahələrinin inkişafı daim dövlətin diqqət mərkəzində saxlanılır.

Azərbaycanda "Taxıl haqqında" qanun Ulu Öndər Heydər Əliyev tərəfindən 16 iyun 2000-ci ildə qüvvəyə minmişdir."Taxıl haqqında" Azərbaycan Respublikasının qanunu taxıl istehsalının, tədarükünün və bazarının təşkilinin, taxıl və taxıl emalı məhsullarının keyfiyyətinin idarəedilməsinin hüquqi əsaslarını müəyyən edir. Bu qanunda taxıl bazarının dövlət tənzimlənməsi üzrə aşağıdakı bəndlər əsas yer tutur[1]:

- taxıl bazarının dövlət tənzimlənməsi müvafiq qaydada təsdiq edilmiş taxıl məhsillarının balansları əsasında yalnız iqtisadi üsullarla həyata keçirilir və aşağıdakılar nəzərdə tutulur;

-qiymət tarazlığının təmin olunması məqsədilə taxıl bazarına əmtəə müdaxiləsi;

- taxıl bazarının monitorinqi, proqnozlaşdırılması və taxılçılıq fəaliyyəti subyektlərinin məlumatlandırılması;

- taxıl bazarında haqsız rəqabətlə mübarizə və yerli istehsalçılara dövlət himayəsi;

- taxıl məhsullarının keyfiyyətinə dair tələblərin normallaşdırılması və sertifikatlaşdırılması.

"Taxıl haqqında" Azərbaycan Respublikasının Qanununa əsasən taxıl məhsullarının göstəricilərinin qiymətləndirilməsi haqqında aşağıdakılar öz əksini tapmışdır:

- Azərbaycan Respublikasında istehsal edilən və respublikaya gətirilən taxıl məhsullarının tərkibi kimyəvi, bioloji, toksioloji və radioloji göstəriciləinə görə təhlil edilir və qiymətlədirilir;

- taxıl məhsullarının keyfiyyətinin qiymətləndirilməsi müəyyən edilmiş, ixtisaslaşdırılmış laboratoriyalarda vahid metodika üzrə aparılır;

-taxılməhsullarının həmçinin dövlət reyestrində gigiyena qeydiyyatına alınır;

- keyfiyyət göstəriciləri qiymətləndirilmiş taxıl məhsullarına alınmış taxıl emalı məhsullarına müvafiq sertifikatlar verilir;

- taxıl məhsullarının sertifatlaşdırılması qaydaları Azərbaycan Respublikasının müvafiq qanunvericiliyi ilə tənzimlənir.

Son vaxtlar Azərbaycanda ən müxtəlif sahələrdə həyata keçirilən islahatlar vətəndaş maraqlarının etibarlı təminatına, eləcə də, sosial problemlərin aradan qaldırılması yolu ilə əhalinin firavan, layiqli həyat tərzinin təmin olunmasına yönəldilmişdir.

Azad bazar iqtisadiyyatı yolunu seçmiş Azərbaycanda sosial yönümlü siyasətin məqsədi heç də sosial bərabərsizliyi aradan götürmək deyil, sadəcə onu tarazlamaq, vətəndaşların maddi vəziyyətindəki kəskin fərqi aradan qaldırmaq, ifrat təbəqələşməyə yol verməmək, cəmiyyətin bütün üzvlərini layiqli həyat səviyyəsi ilə təmin etmək üçün fərdin ictimai statusunu artırmaqdır.Aqrar islahatların uğurla həyata keçirilməsinə olan dövlət qayğısı və bu sahədə sahibkarların inkişafı üçün yaradılmış əlverişli şərait, Azərbaycanda üzümçülüyün keçmiş şöhrətinin yenidən bərpa ediləcəyinə ümid formalaşmasında yerini neft sənayesinə verən Azərbaycan üzümçülüyü yenidən özqızıl dövrünəqaytarılmalıdır[2, 3].

Üzümçülüyün səxsi mülkiyyət şəraitində inkişafı üçün heç olmasa hər rayonda bir üzüm emalı müəssisəsi işə düşməli və sahibkarlarla ilin əvvəlində onların üzüm məhsulunun müvafiq bazar qiymətinə almaq barədə müqaviləbağlamalıdırlar ki, sahibkarlar yetişdirdiyi üzümü saxlamaq və realizə etmək qayğısını çəkməsinlər. Dövlətin sosial siyasəti qiymətlərin tənzimlənməsi məsələsində də özunu qabarıqşəkildə göstərir. Qiymətlərin tənzimlənməsi obyektiv zərurətdən irəli gələn, daxili bazarın qorunması məqsədinə xidmət edən, ən əsası sosial ədalət prinsipinə adekvat olan bir addımdadir və hökumətdən daha çox sahə vətəndaşların maraqlarına uyğundur. Qiymətlərin tənzimlənməsi hökümət tərəfindən qiymətlərin səviyyə və nisbətlərinin ölçülməsinə yaxud stabilləşdirilməsinə yönəldilmlş müxtəlif vasitələrə malik olduğu hüquqlardan və maddi imkanlarından istifadə edilməsinə əsaslanır[3, 4].

Bazar iqtisadiyyatında qiymət münasibətlərinin əsas prinsipləri aşağıdakılardır:

-azad qiymətəmələgəlmənin dövlət qiymət nəzarəti ilə uyğunlaşdırılması;

- tələb və təklifin təsiri altında tarazlıq qiymətləri formalaşdırılması;

-kənd təsərrüfatı məhsullarının və kənd təsərrüfatı üçün sənaye məhsullarının qiymətlərinin ekvivalentliliyinin təminatı;

-təklif qiymətinin hesablanmasında normativ metodların istifadəsi;

-geniş təkrar istehsalının həyata keçirilməsi üçün kifayət edən səviyyədə əmtəə istehsalçılarının gəlirinin təminatı;

- kənd təsərrüfatının effektivliyinin artırılması və istehsal xərclərinin azaldılması.

-məhsulun keyfiyyətindən və onun reallaşma müddətindən asılı olaraq qiymətin diferensiallaşması.

-kənd təsərrüfatında elmi-texniki tərəqqinin stimullaşdırılması;

-qiymət və maliyyə-kredit münasibətlərinin qarşılıqlı əlaqələrinin optimallaşdırılması.

Ümumiyyətlə, dövlət bazarda qiymətlərin tənzimlənməsinə iki istiqamətdə təsir göstərməlidir;

- birinci, dövlət qanunların və bu qanunlardan irəli gələn təlimatların, digər hüquqi normativ sənədlərin işlənib hazırlanmasını və onların qeyri-şərtsiz həyata keçirilməsini təmin etməklə;

- ikincisi, düzgün və qiymət siyasəti yeritməklə, qanunların aliliyini qorumaqla, bütövlükdə bazarda-nizam- intizam yaratmaqla, qiymətlərə düzgün əməl edilməsinə nəzarəti təşkil etməklə və s.

Belə ki, bazar hərəkətinin əsas istiqaməti qiymətdir. Qiymət əmtəələrin, məhsulların və xidmətlərin dəyərinin pul formasını özündə ifadə edir.Həm istehsal məsrəflərinin ödənilməsi, həm də müəssisənin gəliri qiymətdən asılıdır.O, resursların konkret istehsala istiqamətləndirilməsini tənzimləyir. Bazar münasibətlərinin inkişafı şəraitində qiymət bir sıra funksiyaları yerinə yetirir və müxtəlif qiymət növlərinə bölünür.

Dövlətin qiymət və maliyyə-kredit siyasətinin aqrar -sənaye kompleksinin inkişafına təsiri aşağıdakı vəzifələrin həllinə yönəlməlidir:

- ölkənin yeyinti məhsulları ilə özünütəminatının stimullaşdırılması və dövlət ticarət təhlükəsizliyi;

- kənd təsərrüfatı və sənaye arasında ekvivalent münasibətlərə çıxış;

- aqrar sənaye kompleksinin birinci və üçüncü sferalarındakı inhisarçılıgın kənd təsərrüfatına mənfi təsirinin azalması;

- geniş təkrar istehsalın təminatı səviyyəsində kənd əmtəə istehsalçılarının gəlirlərinin dəstəklənməsi;

- elmi-texniki tərəqqinin nailiyyətlərindən istifadəsinə, istehsalın effektivliyinin artırılmasına köməklik etmək;

- dövlət daxilində vahid iqtisadiyyat;

məkanın, yaxın və uzaq xarici bazarlara çıxışın formalaşdırılması.

Bazar şəraitində qiymətin funksiyalarına daxildir:

- ölçmə- qiymət vahid pul nişanlarında əmtəənin dəyərini ölçür. O əmtəə istehsal üçün əməyin zəruri ictimai xərclərini ifadə edir;

-planlaşdırma- məhsulların istehsalı, bölgüsü, mübadiləsi və istehlakının təsərrüfat daxili planlaşdırılmasının dəyər və ifadəsi planlaşdırlan proseslərə qiymət vasitəsi ilə həyata keçirilir;

-tənzimləmə- bazar iqtisadiyyatında qiymət tələb və təklifin tarazlaşdırılmasının əsas aləti kimi çıxış edir.Qiymət əmtəə istehsalçısının və ya satıcısınınalıcının cavab reaksiyası ilə pul tələbini göstərir;

- bölüşdürmə- qiymətin yuxarı qalxması və ya düşməsi sahələri arasında, müəssisələr arasında,

əhalinin sosial qurumları arasında gəlir və mənfəətin yenidən bölüşdürülməsinə gətirib çıxarır;

-nəzarət- qiymət maddi-əşyavi və təbii resursların istifadəsinin onların hərəkətinin və qorunmasının nəzarət və uçot aləti kimi çıxış edir;

-stimullaşdırıcı- qiymət əmtəə istehsalçılarının istehsalın həcminin yüksəldilməsində, xərclərin azalmasında və mənfəətin həcminin artırılmasında maraqlarını stimullaşdırır;

sosial- pərakəndə qiymətin dəyişməsi, əhalinin gəlir və xərclərinin yenidən bölüşdürülməsinə, ailə büdcəsinin dəyişməsinə əhalinin müxtəlif növ əmtəə və xidmətlərindən istifadəsinə təsir göstərir.

Bazar şəraitində məhsul və xidmətlər üzrə qiymətləndirmənin bir neçə metodu mövcuddur[5]:

- orta xərclər üstəgəl gəlir səviyyəsi üzrə qiymətin qoyulması;
- zərərsizliyin və məqsədli gəlirin əldə olunmasının təyinatı;
- məhsulun real dəyəri nəzərə alınaraq qiymətin qoyulması;

ortaqeyri-sabit qiymət səviyyəsi əsasında qiymətin qoyulması.

Bazar şəraitində qiymət sistemi özünü aşağıdakı şəkildə büruzə verir:

- azad (müqavilə ilə)-əmtəə istehsalı alıcının iqtisadi maraqlarını nəzərə alınaraq müəyyən olunan tələb və təklif mexanizmi vasitəsi ilə müəyyənləşir;
- tənzimlənən-bu elə qiymətlərdir ki onların səviyyəsi və dinamikası dövlət tərəfindən tənzimlənir;
- topdan-istehsalçı müəssisənin sifarişçi müəssisəyə məhsulu satacağı qiyməti;
- pərakəndə-alıcıdan asılı olmayaraq məhsulun pərakəndə satışında reallaşan qiymət;
- müqayisəli-dinamikanın fiziki həcmdə, digər müqayisəli göstəricilərin mal dövriyyəsinin ölçülməsi üçün istifadə qiymətlər;
- tədarük-dövlət öz ehtiyacları üçün tədarük etdiyi məhsulların qiyməti;
- zəmanətli-federal fond üçün tədarük olunan məhsulların qiyməti;
- girov-məhsulların girov ilə tədarükündə istifadə olunur;
- transfert-transmilli korporasiyalar çərçivəsində məhsulların çatdırılması üçün hesablaşmalarda tətbiq olunan qiymətlər;
- barter-kənd təsərrüfatı məhsullarının sənaye müəssisəsi və təşkilatlarının məhsullarına dəyişməsində istifadə olunur;
- bazis-ilkin razılaşmalarda son qiymət şəklində istifadə olunan əlavələr və endirimlər vasitəsi ilə düzəliş olunan qiymətlər.

Qiymət əmələgəlmənin ən sadə yolu məhsulun maya dəyəri üzrə müəyyən, standart qiymət artımının əlavə edilməsindən ibarətdir.Qiymət artımının ölçüləri məhsul növlərindən asılı olaraq geniş hüdudlarda dəyişir. Bu metodun çatışmazlıgı ondadır ki, əmtəə istehsalçıları əsasən istehsal xərclərinə rəhbərlik edir və bazarda məhsul və xidmətlərə olan tələbi nəzərə almır [5, 6]. Zərərsizliyin və gəlirin əldə edilməsinin təminatı nəzərə alınaraq qiymətin hesablanma metodikası ümumi xərclərin müqayisəsinə və satış həcminin müxtəlif səviyyələrində gözlənilən gəlirə əsaslanır. Bu halda məhsul buraxılışının həcmi və qiyməti arasında elə uyğunluq yaradılır ki, o müəssisə üçün zəruri olan gəlirin əldə olunmasını təmin edir.

Kənd təsərrüfatında qiymət əmələgəlmənin mexanizmi bütöv sistemi ifadə edir.Məqsədli qiymətlərin hesablanması onun əsas elementlərindən biridir. O, kənd təsərrüfatı əmtəə istehsalçılarını, cətin təbii iqtisadi şəraitdə işləyənləri, sadə təkrar istehsalın həyata keçirilməsi və istehsalın genişləndirilməsi üçün kifayət olan gəlirlərlə təmin edir.

Məhz qeyd edilənlər nəzərə alınmaqla taxılçılıq və üzümçülük məhsulları bazarında qiymətlərin tənzimlənməsinə xüsusi diqqət yetirilməli, bu prosesdə qiymətlərin istehsalın stimullaşdırılmasındakı roluna xüsusi əhəmiyyət verilməlidir.

**ƏDƏBİYYAT**

1. Taxıl haqqında Azərbaycan Respublikasının qanunu. 16 iyun, 2000-ci il. 2. “2012-2020-ci illər Azərbaycan Respublikasında üzümçülüyün inkişafına dair Dövlət Proqramı”. 3.Quliyev E.A., Etibarlı ərzaq təminatı sistemi: kooperasiya və inteqrasiya problemləri, Bakı: “Elm”, 2013, 308 s. 4. Alıyev İ.H. Milli iqtisadiyyat və aqrar sahənin inkişaf problemləri. Bakı, Elm, 2006, 380s. 5. Qasımov Ə. Kənd təsərrüfatının iqtisadiyyatı. Bakı, “İqtisad Universiteti” 2007, 300s. www resplica-news az/index.

**Направление урегулирование цен на рынке виноградных и зерновых продуктов**

**Д.Д.Аллахвердиева**

Зерноводства и виноградарства как основная часть составляющиеся аграрного сектора имеют важную значению в этой отрасли. Потому что, эти отрасли наряди с обеспечением населения с продуктами питания и играет огромную роль обеспечении потребности грубым и концентрированным кормом в животноводстве.

Основное направление рыночного движения это цены. Цены товарных продуктов и оценка стоимости обслуживании выражает форма денег. Выплачивание производственных затрат, а так же доходы предприятий

на много зависит от цен. Он конкретно урегулировает направление ресурсов в производстве. В условиях рыночных отношений, цены выполняют ряд функций и разделяются на несколькие виды.

Самый простой способ получения повышение цен является, повышение цен в зависимости от вида продуктов и меняется в широких пределах. Недостаточность этого метода является то, что потребители товаров в основном контролируют только расходов производства, а потребность на товара и на услуг при этом не учитываются.

***Ключевые слово:*** *зерноводство, рынок, себестоимость, цена, конкуренция, качества, урегулирование.*

## Directions of regulation of the marks manufacture of a grain and vine-growing harvests in market

**J.J. Allahverdiyeva**

Manufacture of a grain organize the base of the agrarian sector and it assumes vital importance in the vine-growing this area. Because pay reimburse the need being of these areas adjoining and itplays the important part in paying of the demand been of the strong and brute the eating.

Basic direction of the market motion are the mark. Mark expresses the money form of the cost value of the commodities, harvests and services in yourself. And paying of the production expenses and come of the establishment and is dependent on from themark. İt regulates direct to the concrete production of those resources. A few number of functions of mark fulfill in the condition of thedevelopment of the market attitudes relations and it is divided into kind of different mark.

Mark consists of the simplest way road of the forming adding of the growth of definite, standard mark on cost price of the harvest. Measure of the growth of mark and it changes in the wide boundaries depending on kind of harvest. Side peculiarity which do not suffice of this method is that commodity producers lead to production expense mostly and it does not take into account the harvest and the demand been in the market.

***Key words:*** *Manufacture of a grain, market, cost price, mark, competition, quality, to regulate.*

